UOT 619..576.89;619..616.995.1

# ŞAHBUZ RAYONU ƏRAZISINDƏ QOYUNLARDA DIKTIOKAULYOZUN EPIZOOTOLOGIYASI

**F.N.İBADOV**
**Naxçıvan Dövlət Universiteti**

*Məqalədə Şahbuz rayonunun kəndlərində qoyunlarda diktiokaulyozun epizootologiyası öz əksini tapmışdır. Koproloji müayinələrin nəticələrinə görə, rayon ərazisində qoyunların diktiokaulyozunun ekstensivliyinin orta göstəricisi 44,4%, 5 q kalda sürfələrin intensivliyinin orta göstəricisi isə 31,7±1,9 ədəd təşkil edir. Helmintoloji yarmanın nəticələrinə əsasən ekstensivliyin orta göstəricisi 40,7%, tapılmış helmintlərin intensivliyinin orta göstəricisi 5,8–24,5 ədəd təşkil edir. Qoyunların diktiokaulyuslarla yoluxmasının əsas səbəbi bu ərazilərdə ekoloji amillərin helmintlərin inkişafı üçün əlverişli olmasıdır.*

***Açar sözlər:*** *helmint, diktiokaulyoz, sürfə, epizootologiya*

Şahbuz rayonu Ermənistan Respublikası ilə sərhədlənməklə Dərələyəz dağ silsiləsi ilə Zəngəzur dağ silsiləsi arasında yerləşir. Şahbuz rayonunun dəniz səviyyəsindən hündürlüyü 1200-3000 m-ə bərabərdir. Havanın orta rütubətliliyi 57%, orta illik atmosfer yağıntıları 400-600 mm olur. Yağıntılar daha çox yaz fəslində düşür. Rayonun müxtəlif yüksəkliklərindəki çəmənlər bitki örtüyü ilə zəngindir, çəmənlər daxilində hündürotlu subalp və alp çəmənləri, alp xalıları aydın seçilir. Bu sahələrdən əsasən xırda buynuzlu heyvandarlıqda istifadə edilir. Ərazinin təbii şəraiti fauna, floranın inkişafı üçün əlverişlidir [1, s. 41].

Kənd təsərrüfatının çox gəlirli sahələrindən biri heyvandarlıqdır. Lakin parazitar xəstəliklər, xüsusilə də müxtəlif helmintoz törədiciləri heyvandarlığa ciddi zərər vurmaqla köklük dərəcəsinin aşağı düşməsinə, bəzən isə körpə heyvanlarda tələfata səbəb olur. Rayonun qoyunçuluq təsərrüfatlarında intensiv müşahidə edilən helmint xəstəliklərindən biri diktiokaulyozdur [ 3, s. 117 - 120 ]

Diktiokaulyoz müxtəlif yaşda olan qoyunların, keçilərin invazion xəstəliyi olmaqla, diktiokaulyuslar əsasən ağciyərin tənəffüs yollarında - traxeya, bronx və bronxiollarda parazitlik edən helmint olub, heyvandarlarda məhsuldarlığın aşağı düşməsinə, körpə heyvanların kütləvi yoluxmasına səbəb olur [ 4, s. 203 ].

Diktiokaulyusların yayılmasına, iqlim faktorları, nəmlik, temperatur, günəş şüaları, həmçinin otlaq sahəsinin qıtlığı, qoyunların darısqal yataqlarda saxlanması təsir edir [ 2, s. 80- 84 ].

Rayon ərazisində 200-ə qədər təbii bulaq, 6 ədəd həcmi 1 milyon $m^3$ – dan çox olan göl, kiçik həcmli 10 –a yaxın göllər və çoxlu bataqlıq və gölməçələr vardır. Ən isti ayın orta temperaturu 15 – 22 º C olur [ 1, s. 65 ]. Bu cür su mənbələrinin, temperaturun optimal olması isə həmin ərazilərdə helmintin sürfələrinin yayılması və inkişafı üçün əlverişli şərait yaradır [ 6, s. 15 – 17 ].

Şahbuz rayon ərazisində aparılan tədqiqatlara əsasən burada qoyunlarda *Dictyocaulus filaria* növü parazitlik edir [ 5, s. 4 – 8 ]. Ədəbiyyat məlumatlarına əsasən, bu helmintlər aralıq sahib olmadan münasib temperatur və nəmlik olduqda üç dəfə qabıq qoymaqla inkişaflarını davam etdirirlər [ 7, s. 23 – 25 ].

Naxçıvan Muxtar Respublikasının coğrafi şəraiti, müxtəlif relyefə malik olması digər bölgələrdən fərqləndiyindən bu helmintlərin öyrənilməsi, onlara qarşı mübarizə tədbirlərini günün aktual problemlərindən birinə çevirmişdir. Heyvan sağlamlığı üçün həmişə təhlükəli xəstəlik hesab edilən diktiokaulyozun epizootologiyasının öyrənilməsi mühüm əhəmiyyət kəsb edən məsələlərdəndir. Bu helmintlər artmaqda olan qoyunçuluq təsərrüfatlarına böyük iqtisadi zərər verir. Muxtar respublika ərazisində qoyunların diktiokaulyozunun epizootologiyasına dair məlumatlar verilsə də, Şahbuz rayonu ərazisində bu istqamətdə tədqiqat işləri aparılmamışdır. Həmçinin rayon ərazisində temperaturun yüksək olmaması, nəmliyin olması, geniş yay otlaqlarına malik olması invaziyanın yayılması üçün şərait yaradır. Bu səbəbdən rayon ərazisində diktiokaulyusların epizootologiyasının müəyyən edilməsi istiqamətində tədqiqat işlərinin aparılması aktualdır.

**Material və metodika.** Tədqiqatlar 2017-ci ilin payızında və 2018-ci ilin yazında Şahbuz rayonunun müxtəlif ekoloji zonalarında yerləşən kəndlərində; Kükü, Biçənək, Nursu, Daylaqlı, Badamlı və Qarababa fərdi və fermer təsərrüfatlarında aparılmışdır. 381 baş qoyun üzərində koproloji müayinə, 138 baş qoyundan isə ağciyər toplanmışdır. Rayonun ekoloji zonalarındakı kəndlərindəki fərdi və fermer təsərrüfatlarında müxtəlif yaş və cinslərdən olan 381 baş (78 baş

Kükü, 69 baş Biçənək, 72 baş Nursu, 64 baş Daylaqlı, 52 baş Badamlı, 46 baş Qarababa ) qoyunun kal nümunələri götürülərək Vayda və Berman üsulu ilə koproloji müayinə edildi.

Ət kəsim məntəqələrindən götürülmüş 138 baş ( Kükü 31 ədəd, Biçənək 28 ədəd, Nursu 19 ədəd, Daylaqlı 16 ədəd, Badamlı 21 ədəd, Qarababa 23 ədəd ) qoyunun ağciyərləri laboratoriyaya gətirilərək Skryabinin natamam yarma üsulu ilə yarılaraq helmintlər müəyyən edildi.

**Nəticə.** Ümumilikdə 381 baş heyvanın kal nümunələri koproloji müayinə edilərək, nəticəsi aşağıdakı cədvəldə öz əksini tapmışdır.

**Cədvəl 1**

**Koproloji müayinələrə əsasən qoyunların diktiokaulyus filaria ilə yoluxması**

| Kəndlər | Müayinə edilmişdir | Yolux-muşdur | İnvaziyanın ekstenliyi (İE ), % - lə | 5 qram kalda invazi yanın intensivliyi (İİ), ədəd |
|---|---|---|---|---|
| Kükü | 78 | 36 | 46,1 | 38,2 ± 2,7 |
| Biçənək | 69 | 29 | 42,0 | 34,3 ± 2,8 |
| Nursu | 72 | 31 | 43,0 | 36,4 ± 1,9 |
| Daylaqlı | 64 | 28 | 43,7 | 29,5 ± 1,6 |
| Badamlı | 52 | 24 | 46,1 | 27,4 ± 1,5 |
| Qarababa | 46 | 21 | 45,6 | 24,8 ± 1,2 |
| Cəmi | 381 | 169 | - | - |
| Orta göstərici | - | - | 44,4 | 31,7 ± 1,9 |

Cədvəldə koproloji müayinənin nəticələrinə nəzər saldıqda aydın olur ki, Kükü kəndində 78 baş qoyun müayinə edilərək 36 başında diktiokaulyus sürfələri tapılmış, burada İE - 46,1 %, İİ – 38,2 ± 2,7 olmuş, müvafiq olaraq Biçənək kəndində 69 baş müayinə edilmiş, 29 baş heyvanda diktiokaulyus sürfəsi aşkar olunmuş, İE – 42,0 %, İİ – 34,3 ± 2,8 olmuşdur. Nursu kəndində 72 baş qoyun müayinə edilərək onlardan 31 başında diktiokaulyus sürfələri tapılmış, İE - 43,0 %, İİ - 36,4 ± 1,9 ədəd, Daylaqlı kəndində 64 baş müayinə edilərək 28 baş qoyunda diktiokaulyus sürfəsi tapılmış və İE - 43,7 %, İE - 29,5 ± 1,6 ədəd, Badamlı kəndində 52 baş heyvanın müayinəsi zamanı 24 başında diktiokaulyus sürfəsi tapılmış və İE - 46,1 %, İİ - 27,4 ± 1,5 ədəd, Qarababa kəndində isə 46 baş heyvan müayinə edilmiş və onların 21 başında diktiokaulyus sürfəsi aşkar olunmuşdur, burada İE - 45,6 %, İİ - 24,8 ± 1,2 ədəd olduğu nəzərə çarpır.

Koproloji müayinə aparılmış kəndlərdə 381 baş heyvandan 169 başda yoluxma müəyyən olunmuşdur ki, bununla da İE - 44,4 %, İİ - 31,7 ± 1,9 ədəd olduğu tərəfimizdən aşkarlanmışdır.

Şəxsi istifadə üçün kəsilmiş 138 baş heyvanın ağciyəri müayinə edilərək, nəticəsi aşağıdakı cədvəldə öz əksini tapmışdır.

**Cədvəl 2**

**Natamam helmintoloji yarma nəticələri ( D. Filaria )**

| Kəndlər | Müayinə edilmişdir | Yoluxmuşdur | İnvaziyanın eksten - sivliyi ( İE ), % -lə | Tapılmış diktio - kaulyusların sayı ( İİ ), ədəd |
|---|---|---|---|---|
| Kükü | 31 | 12 | 38,7 | 7 – 32 |
| Biçənək | 28 | 10 | 35,7 | 6 – 29 |
| Nursu | 19 | 8 | 42,1 | 5 – 22 |
| Daylaqlı | 16 | 6 | 37,5 | 4 – 19 |
| Badamlı | 21 | 9 | 42,8 | 6 – 24 |
| Qarababa | 23 | 11 | 47,8 | 7 – 21 |
| Cəmi : | 138 | 56 | - | - |
| Orta göstərici | - | - | 40,7 | 5,8 – 24,5 |

Cədvələ diqqət yetirdikdə məlum olur ki, Kükü kəndində 31 baş heyvanın ağciyəri müayinə edilmiş və onlardan 12 baş heyvanın ağciyərindən diktiokaulyus tapılmışdır. Burada İE - 38,7 %, İİ – 6 - 32 ədəd, Biçənək kəndində 28 baş heyvanın orqanının müayinəsi zamanı isə, 10 baş heyvanda yoluxmanın olduğu aşkarlanmışdır. Həmin kənddə İE - 35,7 %, İİ-5-22 ədəd olmuşdur. Nursu kəndində həmçinin 19 baş heyvandan götürülmüş orqanın müayinəsi zamanı 8 baş heyvanın həmin invaziya ilə yoluxduğu məlum olmuşdur. Həmin kənddə İE - 42,1 %, İİ – 5 - 22 ədəd olmuşdur. Daylaqlı kəndində 16 baş qoyundan götürülmüş orqanın müayinəsi zamanı 6 baş heyvanda yoluxma görülmüşdür. Burada İE - 37,5 %, İİ – 4 - 19 ədəd olmuşdur. Badamlı kəndində isə 21 baş heyvanın orqanı müayinə edilərək 9 baş heyvanda diktiokaulyoz olduğu məlum olmuşdur. İE - 42,8 %, İİ – 6 - 24 ədəd olmuşdur. Müayinə apardığımız digər Qarababa kəndində 23 baş heyvanın orqanı müayinə edilmişdir. Burada 11 heyvandan diktiokaulyus tapılmaqla İE - 47,8 %, İİ – 7 - 21 ədəd olmuşdur.

Şəxsi istifadə üçün kəsilmiş müxtəlif cins və yaşda olan 138 baş heyvanın natamam yarma müayinəsi zamanı 56 baş heyvanda yoluxma müəyyən olunmuşdur ki, bununla da İE - 40,7 %, İİ – 5,8 - 24,5 ədəd olduğunu göstərir.

Koproloji və natamam helmintoloji yarma müayinələrinin nəticələri zamanı məlum olmuşdur ki, Şahbuz rayonunun müxtəlif ekoloji zonalarında yerləşən kəndlərində diktiokaulyoz kifayət qədər yayılmışdır.

Rayonun ekoloji zonalarında bulaqların, göllərin, çoxlu bataqlıq və gölməçələrin, “sucaq” sahələrin olması, temperaturun və nəmliyin normada olması helmintin sürfələrinin yayılması və inkişafı üçün əlverişli şərait yaradır.

## ƏDƏBİYYAT

1. Babayev.S. Naxçıvan Muxtar Respublikasının coğrafiyası. Bakı: Elm, 1999, 226 s. 2.Məhərrəmov S.H. Naxçıvan Muxtar Respublikasının helmintofaunası. Naxçıvan, 2014, 142 s. 3.Məmmədov E.N. Xırdabuynuzlu heyvanların anoplosefalyatozlarının epizootoloji xüsusiyyətləri // Naxçıvan Dövlət Universitetinin Elmi əsərləri. Təbiət elmləri və tibb seriyası. Naxçıvan, 2010, № 1, s.117-120. 4.К.И.Абуладзе, Н.В.Демидов, А.А.Непоклонов, С.Н.Никольский, Н.В.Равлова, А.В.Степанов. Паразитология и инвазионные болезни сельскохозяйственных животных. Москва, ВО Агропромиздат, 1990, 464 с. 5.Məmmədov A.Q., Hacıyev Y.H., Şirinov N.M., Ağayev Ə.Ə. Baytarlıq parazitologiyası. Bakı: Azərnəşr, 1986, 435 s. 6. Məhərrəmov S.H. Temperatur və nəmliyin strongilyatların yayılmasına təsiri // Naxçıvan Dövlət Universitetinin Elmi əsərləri. Naxçıvan: Qeyrət, 2011, № 2 (38), s.15–17. 7.Hacıyev Y. Məmmədov Ə. Gövşəyən heyvanların qurd xəstəlikləri və onlara qarşı profilaktik tədbirlər. Bakı. 2003. 78 s.

### Эпизоотология диктиокаулеза овец на территории Шахбузского района

**Ф.Н.Ибадов**

В статье отражен эпизоотология диктиокаулеза овец в селах Шахбузского района. Согласно результатам копрологических обследований, средний показатель экстенсивности диктиокаулеза овец на территории составил 44,4%, а в 5 г фекалий интенсивность личинок составляет 31,7±1,9 экземпляров. По результатам гельминтологических вскрытий средний показатель экстенсивности 40,7%, интенсивность найденных гельминтов составляет 5,8-24,5 экземпляров. Основной причиной заражения овец на этих территориях диктиокаулюсами являются благоприятные для развития гельминтов экологические факторы.

***Ключевые слова:*** *гельминт, диктиокаулез, личинка, эпизоотология*

### Dictyocauliasis epizootology of sheep in the area of Shahbuz district

**F.N.Ibadov**

The paper reflects the epozoology of dictyocauliasis of sheep in the villages of the Shahbuz district. According to the scatological checkup, in the region the average extensiveness of the dictyocauliasis of the sheep is 44,4%, in 5 g of facces the average intensity of larva is 31,7±1,9. And according to the helminthological cutting average index of extensiveness is 40,7%, the helminth infection intensity is 5,8-24,5 specimens. The main cause of this infection of dictyocaulus of the sheep is ecological factors that facilitate for the development of worms in this territory.

***Key words:*** *helminthes, dictyocauliasis, larva, epizootology*